BAKI DÖVLƏT UNİVERSİTETİ

QAFQAZ MÜSƏLMANLARI İDARƏSİ

*Azərbaycan Xalq Cümhuriyyəti*

100

# MÜSƏLMAN ŞƏRQİNDƏ İLK PARLAMENTLİ RESPUBLİKA

## AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİNİN 100 İLLİK YUBİLEYİNƏ HƏSR OLUNMUŞ BEYNƏLXALQ ELMİ KONFRANSIN MATERİALLARI

Azərbaycan Xalq Cümhuriyyəti

100

# MÜSƏLMAN ŞƏRQİNDƏ İLK PARLAMENTLİ RESPUBLİKA

**Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyinə həsr olunmuş beynəlxalq elmi konfransın**

## MATERİALLARI

**21-23 may 2018, Bakı**

## KONFRANSIN TƏŞKİLAT KOMİTƏSİNİN TƏRKİBİ

| | | |
|---|---|---|
| **Akademik Abel Məhərrəmov** | – | Bakı Dövlət Universitetinin rektoru |
| **Şeyxülislam Allahşükür Paşazadə** | – | Qafqaz Müsəlmanları İdarəsinin sədri |
| **Prof. Dr. Şükrü Halûk Akalın** | – | Hacettepe Üniversitesi, Türkiyə |
| **Prof. Elio Brancaforte** | – | Tuleyn Universiteti, ABŞ |
| **Prof. Dr. Kerem Karabulut** | – | Atatürk Üniversitesi, Türkiyə |
| **Prof. Araylım Musaqaliyeva** | – | L.Qumilyov ad. Avrasiya Milli Universiteti, Qazaxıstan |
| **Akad.Q.Q.Matişov** | – | Rusiya Elmlər Akademiyası |
| **Prof. Michael Reynolds** | – | Prinston Universiteti, ABŞ |
| **Dr. Monika Rind-Pawlowski** | – | Institute for Empirical Linguistics, Goethe University, Frankfurt, Almaniya |
| **Prof. Jibek Sızdıkova** | – | MDU, Mərkəzi Asiya və Qafqaz ölkələri kafedrasının müdiri, Rusiya |
| **AMEA-nın müxbir üzvü Aydın Kazımzadə** | – | BDU, Elm və İnnovasiyalar üzrə prorektor |
| **Prof. İradə Əliyeva** | – | BDU, Tədrisin təşkili və təlim texnologiyaları üzrə prorektor |
| **Prof.Sani Hacıyev** | – | BDU, Sosial məsələlər, tələbələrlə iş və ictimaiyyətlə əlaqələr üzrə prorektor |
| **Dos. Fikrət Şiriyev** | – | BDU, Həmkarlar İttifaqı Komitəsinin sədri |
| **Hacı Salman Musayev** | – | Qafqaz Müsəlmanları İdarəsi sədrinin birinci müavini |
| **Qəmərxanım Cavadlı** | – | Qafqaz Müsəlmanları İdarəsi sədrinin müavini |
| **Dos. Azad Rzayev** | – | BDU, Tarix fakültəsinin dekanı |
| **Prof.Sevda Süleymanova** | – | BDU, Tarix fakültəsinin elmi işlər üzrə dekan müavini |
| **Dos. Bəxtiyar Nəbiyev** | – | BDU, Tarix fakültəsinin bakalavr təhsili üzrə dekan müavini |
| **Prof. Anar İsgəndərov** | – | BDU, Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrasının müdiri |
| **Akad. Yaqub Mahmudov** | – | BDU, Qədim dünya və orta əsrlər tarixi kafedrasının müdiri |
| **Dos. Mehman Abdullayev** | – | BDU, Azərbaycan tarixi (təbiət fakültələri üzrə) kafedrasının müdiri |
| **Dos. Məmməd Fətəliyev** | – | BDU, Avropa və Amerika ölkələrinin yeni və müasir tarixi kafedrasının müdiri |
| **Prof. Qüdrət İsmayılzadə** | – | BDU, Arxeologiya və etnoqrafiya kafedrasının müdiri |
| **Prof.Əsmət Muxtarova** | – | BDU, Türk xalqları tarixi kafedrasının müdiri |
| **Prof. İradə Hüseynova** | – | BDU, Qafqaz xalqları tarixi kafedrasının müdiri |
| **Dos.Abutalıb Cəlilov** | – | BDU, Slavyan ölkələri tarixi kafedrasının müdiri |
| **Dos.İqbal Ağayev** | – | BDU, Asiya və Afrika ölkələri kafedrasının müdiri |
| **Dos. Sevinc Qasımova** | – | BDU, Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrası |
| **Dos. Mətanət Məmmədova** | – | BDU, Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrası |
| **Dos. Lalə Əliyeva** | – | BDU, Azərbaycan tarixi (təbiət fakültələri üzrə) kafedrası |
| **Dos. Elvira Lətifova** | – | BDU, Qədim dünya və orta əsrlər tarixi kafedrası |
| **Dos. Arzu Məmmədova** | – | BDU, Azərbaycan tarixi (təbiət fakültələri üzrə) kafedrası |
| **Dos. Aydın Məmmədov** | – | BDU, Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrası |
| **Dos. Samir İsmayılov** | – | BDU, Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrası |
| **Dos. Nurlan Abbasov** | – | BDU, Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrası |
| **Kəmalə Məmmədova** | – | BDU, Mənbəşünaslıq, tarixşünaslıq və metodika kafedrası, baş laborant |
| **Elşən Aslanov** | – | BDU, Tarix fakültəsi, dissertant |
| **Zəhra İslamova** | – | BDU, Azərbaycan tarixi (təbiət fakültələri üzrə) kafedrası |
| **Ulduz Paşayeva** | – | Dünya azərbaycanlıları: tarixi-demoqrafiya ETL, böyük elmi işçi |
| **Rəna Hüseynova** | – | Azərbaycanın maddi-mədəniyyət tarixi ETL, böyük elmi işçi |
| **Anzulə Əmirova** | – | "Bakı Universiteti" qəzeti, baş redaktor |
| **Nərgiz Kərimova** | – | BDU, Tarix fakültəsi, magistr |

ISBN 978-9952-8142-7-9

**© Bakı Dövlət Universiteti, 2018**

**© Qafqaz Müsəlmanları İdarəsi, 2018**

3. Nəcəfli Tofiq .Səfəvi- Osmanlı münasibətləri.Bakı:Turxan NPB, 2014.
4. Mahmudov Yaqub. Azərbaycan diplomatiyası. Bakı: Təhsil, 2006.

**İngilis dilində**

5. Bernadette, Andrea, "Lady Sherley: The first Persian in England?, The Muslim World , Vol. 95, № 2, 2005, Hartford, p. 279-295.
6. Chick Herbert, Matthee, Rudi, 2012, A Chronicle of the Carmelites in Persia: The Safavids and the Papal mission of the 17th and 18th centuries, I.B.Tairus , London, 2012.
7. Flannery, John,The Mission of the Portuguese Augustinians to Persia and Beyond (1602-1747), Brill Publishers, Leiden,2012.
8. Gorder, van Christian, Christianity in Persia and the status of non- muslims in Iran, Lexington books, Plymouth, 2010.
9. Knobler Adam, Mytology and Diplomacy in the Age of Exploration., Brill, Leiden, 2016.
10. Mansour, Opher, "Picturing Global Conversion: Art and Diplomacy at the Court of Paul V (1605-1621)", Journal of Early Modern History,Vol. 17, № 5-6 ,2013, p. 525-559.
11. Morgan, Delmar, 2010, Early Voyages and Travels to Russia and Persia: ByAnthony Jenkinson and Other Englishmen, Cambridge University Press, Cambridge.
12. Quinn, Sholeh, Shah Abbas: The King who refashioned Iran (Makers of the Muslim World) , Oneworld publications ,London, 2015.
13. Rubies, Joan-Paul, "Political Rationality and Cultural Distance in European Embassies to Shah Abbas" , Journal of early modern history , Vol. 20, № 4, 2016, 351-389.
14. Savory, Roger, Iran under the Safavids, Cambridge university, Cambridge, 2007
15. Willem, Floor, Edmund, Herzing, Iran and the World in the Safavid age, I. B. Tauris, London, 2012.
16. Zeeb, Martha, Katerina, Gouvéa, Antonio, 1934, The latin letters of Antonio de Gouvea / Antonio de Gouvea., Solana, Philadelphia, 1934.

## AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİNİN TARİX ELMİNİN İNKİŞAFINDA YERİ VƏ ROLU

**Doktorant Elnur Nəciyev**

Azərbaycan xalqının çar Rusiyasına qarşı milli azadlıq mübarizəsi nəticəsində 1918-ci il, may ayının 28-də Şimali Azərbaycanda (Rusiya Azərbaycanında) müstəqil Azərbaycan Xalq Cümhuriyyətinin əsası qoyuldu. Qurulan Cümhuriyyət dünya tarixinin ən demokratik dövlətlərindən biri olub, türk-müsəlman Şərqində ilk parlamentli respublika idi. Qısa müddət ərzində mövcud olmasına baxmayaraq Azərbaycanda elmin, xüsusilə də tarix elminin inkişafında mühüm işlər görməyə nail olmuşdur.

1919-cu il sentyabrın 1-də Milli Şurada Bakıda universitetinin açılması haqqında qanunun qəbulu [4] və bu qanunda universitetin 4 fakültədən birinin tarix-filologiya fakültəsi olmasının nəzərdə tutulması tarix elminin inkişafında mühüm addım idi. Universitetdə ilk mühazirə də məhz tarixdən olmuşdur. Qeyd edək ki, 1919-cu il noyabrın 15-də universitetin auditoriyalarında ilk mühazirələr başlandı [5, 30]. Tarix-filologiya fakültəsində Məhəmməd Əmin Rəsulzadə və maarif naziri Rəşid Qaplanov Osmanlı ədəbiyyatından, Məhəmməd ağa Şahtaxtlı isə Azərbaycan dilinin qrammatikasından mühazirələr oxuyurdular [2, 75]. Universitetin təşkilat komissiyası V.İ.Razumovskini yekdilliklə universitetin rektoru seçərkən görkəmli tarixçi, publisist N.A.Dubrovskini də tarix-filologiya fakültəsinin dekanı seçmişdi. Sentyabrın 10-da isə universitet komissiyası Y.İ.Baybakovu, L.A.İşkovu, L.Q.Lopatinskini, A.B.Selixanoviçi tarix-filologiya fakültəsinə professor vəzifəsində işə dəvət etməyi qərara aldı [2, 202]. 1919 il noyabrın 15-də - universitetin açılış günü ümumi tarixdən ilk mühazirəni məhz N.A.Dubrovski oxumuşdu. O, həm də universitetin ümumi tarix kafedrasının professoru idi [2, 313]. Qeyd edək ki, tarixin ali məktəbdə tədrisi üçün yerli mütəxəssislər çatışmadığına görə Parlamentin 1919-cu il 1 sentyabr tarixli qərarına əsasən, Cümhuriyyət hökuməti tədbirlər görüb. Belə ki, tarix-filologiya ixtisası üzrə təhsil almaq üçün Fransanın Paris Universitetinə, Türkiyənin İstanbul Universitetinə tələbələr göndərilmişdi.

Azərbaycan Xalq Cümhuriyyətinin ən böyük xidmətlərindən biri də "Müsəlman Şərqini öyrənən cəmiyyət" adlı təşkilatın yaradılması idi. Bu cəmiyyət 1919-cu il dekabr ayının 29-da yaradıldı. Bakı Dövlət Universitetinin nəzdində təşkil edilən bu cəmiyyətin yaradılmasında əsas məqsəd islam dininə etiqad edən xalqların, onların yaşadıqları ölkələrin, o cümlədən də Azərbaycanın tarixini, həmçinin müsəlman mədəniyyətinin inkişafına bu və ya digər dərəcədə təsir göstərmiş tarixi və mədəni amillərin öyrənilməsi idi. "Müsəlman Şərqini öyrənən cəmiyyət" xüsusilə Azərbaycan, Türkiyə, İran və Türküstanın tarix, dil, arxeoloji və etnoqrafik baxımından öyrənilməsinə xüsusi önəm verirdi. Qeyri-hökumət təşkilatı olan bu cəmiyyətin sədri L.A.Zimin, sədrin müavini V.A. Belyayev, katib Seydiyev, xəzinədar Abdulla bəy Sübhanverdixanov (Divanbəyoğlu) seçilmişdilər. Cavad bəy Rəfibəyli, general-leytenant Məmməd bəy Sulkeviç də cəmiyyətin üzvləri arasında idilər. Əldə olunan əlyazmalar və materiallar cəmiyyətin muzeyinə toplanmalı, yaxud mühafizə və sistemləşdirilmək üçün "İstiqlal" milli muzeyinə verilməli, onların nəşri və tədqiq olunması ilə Bakı Dövlət Universiteti məşğul olmalı idi. Qədim sikkələrin toplanmasına, salamat qalmış köhnə binaların və qədim şəhər

qalıqlarının dəqiq və ətraflı qeydiyyata alınmasına xüsusi diqqət yetirilirdi. Müsəlman Şərqinin öyrənilməsi ilə maraqlanan azərbaycanlıların işə cəlb olunmasını və onların lazımi elmi hazırlıq keçməsini cəmiyyət özünün əsas vəzifələrindən hesab edirdi. Cəmiyyətin nizamnaməsi 1920-ci il fevralın 2-də təsdiq edilmişdi. Cəmiyyət 1920-ci ilin əvvəllərində Bakıdakı Şirvanşahlar sarayının bərpası ilə məşğul olmuşdur. Bu abidənin mühafizəsi üçün M.Sulkeviç, V.A.Belyayev və Nəbioğludan ibarət komissiya yaradılmışdı. Cəmiyyət müsəlman incəsənətinə və mədəniyyətinə həsr olunmuş sərgi hazırlanması ilə məşğul olmuş, sərgini 1920-ci ilin sentyabrında açmaq, Azərbaycanın hər yerindən eksponatlar toplamaq nəzərdə tutulmuşdu. Cəmiyyət Tiflisdə Azərbaycana və müsəlman Şərqinə aid ərəb, fars və türkdilli əlyazmaları ilə tanışlığa, Zaqatalanın arxeoloji baxımdan tədqiqinə, yerli kurqan arxeoloji abidələrinin planlarının çəkilməsinə, qədim Azərbaycanın paytaxt şəhərlərindən olan Bərdənin öyrənilməsinə, Quba qəzasındakı Şabran şəhərinin yerinin müəyyənləşdirilməsinə, Nizami Gəncəvinin qəbirüstü abidəsinin, Gəncədə Şah Abbas dövrü abidələrinin, Suraxanıda Xilə məscidinin, Bülbülə kəndində İmamzadə qəbrinin, Mərdəkan qalalarının tədqiqinə dair elmi tədqiqat planları hazırlamışdı. Cəmiyyətin iclaslarında tarix, numizmatika, şərqşünaslıq və incəsənətə dair silsilə mühazirələr oxunurdu. 1920-ci ilin aprelin 28-də Cümhuriyyətin süqutundan sonra Müsəlman Şərqini Öyrənən Cəmiyyətin fəaliyyəti dayandırıldı [3, 234-235]. Cəmiyyətə sədrlik edən türkoloq, ərəbşünas, iranşünas, arxeoloq, tarixçi, Bakı Dövlət Universitetində Şərqşünaslıq fakültəsinin ərəb dili kafedrasının dosenti L.A.Ziminin (1886-1920) fəaliyyətinə [13, 61] də xüsusi diqqət yetirmək lazımdır. Akademik V.V.Bartoldun ən bacarıqlı tələbələrindən biri olan Ziminin Azərbaycanla bağlılığı Zakaspi müvəqqəti hökuməti vasitəsi ilə yaranmışdır. Belə ki, Zakaspi hökuməti Azərbaycan Xalq Cümhuriyyəti hökuməti ilə münasibətlər qurmağa çalışırdı. Cümhuriyyət hökuməti 1919-cu il fevralın 12-də Zakaspi hökuməti ilə əlaqə yaradıb, danışıqlara girmək barədə müvafiq nazirliklərə tapşırıq vermişdi. Həmin il aprelin 2-də Aşqabadda Azərbaycan konsulluğu açılmış, yayında isə Zakaspi hökumətinin də Bakıda konsulluğu fəaliyyətə başlamışdı. Zimin Zakaspidə qurulan bu eser hökumətinin xarici işlər üzrə komissarı idi. Çox güman ki, Zimin 1919-cu ilin oktyabrında Qırmızı ordunun hücumu nəticəsində Zakaspi hökuməti süqut etdikdən sonra bəzi eser nümayəndələr kimi mühacirət etmiş [3, 444] və bu məqsədlə Azərbaycana sığınmağa qərar vermişdir. Onun elmi və idarəçilik potensialını yüksək dəyərləndirən Azərbaycan Xalq Cümhuriyyəti hökuməti "Müsəlman Şərqini öyrənən cəmiyyət"in sədrliyini məhz ona tapşırmışdı. Sədr təyin edilən qədər 1919-cu ilin noyabrından Bakı Dövlət Universitetində Şərqşünaslıq fakültəsində ərəbşünaslıq kafedrasının dosenti olmuş və ərəb dili üzrə tədrislə məşğul olmuşdur. Həmin vaxtdan 1920-ci ilin mayın 10-a qədər Bakıda yaşamış və XI Qırmızı Ordunun Azərbaycanı işğalından sonra həbs edilərək güllələnmişdir [12, 173-174]. Cəmiyyətin sədri kimi digər üzvləri də bütövlükdə elmin inkişafına ən yüksək səviyyədə töhfə vermək qabiliyyətinə sahib şəxsiyyətlər idi. Abdulla bəy Sübhanverdixanov yazıçı, maarif xadimi, etnoqraf, folklorşünas idi. O, Qori müəllimlər seminarıyasını bitirmiş, Bakı Dövlət Universiteti tarix fakultəsinin Şərq şöbəsində təhsil almışdır. Azərbaycan Xalq Cümhuriyyəti dövründə daxili işlər nazirliyində tərcüməçi işləmiş, qeyri-türk məmurların yenidən hazırlanması üçün dövlət tərəfindən təşkil edilmiş kurslarda Azərbaycan dili fənnindən dərs demişdir. O, hətta sovet dövründə də elmi fəaliyyətini davam etdirmişdir. Tarix, etnoqrafiya, folklor və təbiətşünaslıq sahəsində elmi tədqiqat aparmış, "Müctəhid feodal Ağa Mir Fəttah", "Şəki xanlarının tarixi və onların nəsli", "Türk sistemli kəndlərdə totemizm", "İran və Osmanlı məsələsi" əsərlərini yazmış, beş cildlik Azərbaycan tarixini yazmaq üçün material toplamışdır [2, 308]. Cavad bəy Rəfibəyli isə Kiyev İmperator Universitetinin tarix-genologiya fakültəsini bitirməklə yanaşı, alman, fransız, latın, ərəb və fars dülərini bilirdi. Azərbaycanın mədəniyyətinə aid sanballı əsərlərin müəllifidir [3, 296].

Azərbaycan Cümhuriyyəti fəaliyyət göstərdiyi qısa, lakin çətin və mürəkkəb şəraitə görə arxiv işində dəyişiklik yaratmaq istiqamətində tədbirlər görsə də bu işini tam başa çatdırmağa nail olmadı. Belə ki, Dövlət nəzarəti idarəsi 1918-ci il noyabrın 3-də Azərbaycan dövləti ərazisindəki, demək olar, bütün dövlət təşkilatlarının kargüzarlıq və qeydiyyat işinin müharibə və inqilabi şəraitlə əlaqədar olaraq bərbad vəziyyətə düşdüyünü və əsaslı surətdə qaydaya salınmalı olduğunu bildirdi. Azərbaycan hökuməti çətin şəraitdə fəaliyyət göstərməsinə baxmayaraq, bu məsələyə xüsusi diqqət yetirirdi. Hökumətin Tiflisdə yaradılması, bir müddət orada fəaliyyətdən sonra Gəncəyə köçürülməsi, nəhayət, Bakıda fəaliyyətə başlaması formalaşmaqda olan dövlət hakimiyyəti orqanlarının kargüzarlıq sənədlərinin mühafizəsində çətinlik yaradırdı. 1918-ci ilin oktyabrında sığorta cəmiyyəti idarələrindən biri binasını dəyişərkən keçmiş hərbi-sənaye kompleksinin atılmış arxiv sənədləri aşkar edildi. Onların siyahısı dərhal tutulub, pərakəndə sənədlər yığılıb rəflərə qoyulub, bir hissəsi bağlanıb ayrıca otağa yerləşdirildi. Azərbaycan Xalq Cümhuriyyətinin Xarici İşlər Nazirliyi haqqında Əsasnamədə də arxiv işinə böyük əhəmiyyət verilirdi. Həmin Əsasnaməyə görə Xarici İşlər Nazirliyi dəftərxanası tərkibində arxiv yaradılırdı. Burada Azərbaycanda baş verən mühüm hadisələrə aid aktlar və sənədlər, habelə qaytarılanan kitablar və nazirliyin bütün şöbələrinin sənədləri mühafizə edilirdi. Arxivariusa Cənubi Qafqaza, başlıca olaraq, Azərbaycana aid aktları, sənədləri və digər kağızları toplayıb sistemləşdirmək tapşırıldı. Beləliklə, kargüzarlıq xidmətinə və arxivə vahid sistem kimi baxılırdı. Bütün bunlara baxmayaraq Azərbaycanda dövlət arxivləri yalnız 1920-ci il 28 aprel işğalından sonra yaradıldı [2, 125]. Bununla belə, Azərbaycan Xalq Cümhuriyyəti dövründə tarixin tədqiqində əvəzedilməz qaynaq rolu daşıyan arxiv sənəd və materiallarının həm elmi, həm də praktik əhəmiyyəti nəzərə alınaraq, arxiv işinin təşkili və həyata keçirilməsinə nail olundu.

1919-cu il dekabrın 7-də Azərbaycan Parlamentinin işə başlamasının ildönümü münasibətilə onun binasında açılmış və Parlamentin nəzdində fəaliyyət göstərmişdir. Muzeyin təsisi ilə əlaqədar "Azərbaycan" qəzeti yazırdı: "Sənələrdən bəri bəslədiyimiz bir arzu var ki, o da vətənimiz Azərbaycanda bir milli muzey təsisidir... Sabiq Rusiya zamanında təsis edəcəyimiz muzeyin adını "milli muzey" qoymaq fikrində idiksə də, bu gün fərdimizin köksünü qabardan istiqlal şüarı olmasına görə, "İstiqlal" muzesi olmasını əhəmiyyətli görürüz" [1; 10]. Bu muzey Azərbaycanın tarix və mədəniyyətini, milli bədii irsini nümayiş və təbliğ edən ilk dövlət muzeyidir. İstiqlal muzeyində milli dekorativ sənət nümunələri, xalça və bədii tikmələr, silahlar, əlyazmalar, Quranın nadir nüsxələri, müxtəlif mövzularda qiymətli kitablar

toplanmışdı. Muzeyin açılışına hazırlıq görülərkən 1919-cu il noyabrın 6-da tərtib olunmuş bir sənəddə (onu həm muzeyin yaradıcıları olan sənətşünaslar Hüseyn bəy Mirzəcamalov və Məhəmməd Ağaoğlu, həm də Azərbaycan Parlamenti sədrinin müavinləri Həsən bəy Ağayev, Sultanməcid Qənizadə və Parlamentin rəyasət heyətinin digər məsul əməkdaşları imzalamışlar) muzeyin əsasnaməsi, uçot-mühafizə üzrə təlimat, fond-satınalma komissiyası haqqında müddəalar yığcam şəkildə əks olunmuşdu. Sənəddə göstərilirdi ki, muzeyə verilən hər bir əşya milli sərvətdir, əşya sahiblərinin ailə üzvləri gələcəkdə onları tələb edə bilməzlər. Muzeyə hədiyyə olunmuş əşyalar geri qaytarılmır. Sənədin 3-cü bəndində deyilirdi: "İstiqlal muzeyi milli bir müəssisə olduğu üçün muzeydə mövcud bütün əşya milli mal hesab edilir. Heç kəs və heç bir müəssisə o şeylərə sahib ola bilməz" [3, 64-65].

Bütövlükdə Azərbaycan Cümhuriyyətinin mövcud olduğu qısa zaman kəsiyindəki - bu iki illik dövrdəki fəaliyyəti ilə kifayətlənməyən bəzi Cümhuriyyət xadimləri, başda Məhəmməd Əmin Rəsulzadə olmaqla Azərbaycan Cümhuriyyətinin süqutundan sonra qələmə aldıqları əsərlərlə Azərbaycan tarix elminin obyektiv şəkildə tədqiqinə lazımi istiqamət və töhfə verməyə nail oldular. M.Ə.Rəsulzadə "Çağdaş Azərbaycan tarixi" adlı əsərində belə yazır: "Milli Azərbaycan Respublikasının qurulduğu 1918-ci ilin 28 mayı qədər çağdaş Azərbaycan tarixinin ünlü bir günü yoxdur. Çağdaş Azərbaycan tarixinin ibtidasını on doqquzuncu əsrin başlanğıcından saya bilərik. Bu tarixdən bəri Azərbaycan cəmiyyəti düşdüyü çətin şəraitə baxmayaraq orta çağların əsaslarını zehniyyətlərindən sıyıraraq çağdaş mədəniyyətə doğru getmişdir. Həmin tarixdə, bir neçə feodal xanlıqlar halında istilaya uğrayan Azərbaycan 1918-ci ilin 28 mayında beynəlxalq həyat səhnəsinə tək bir millət olaraq çıxdı və respublika şəklində qurduğu dövlətin istiqlalını bütün cahana elan etdi. Çağdaş Azərbaycan tarixi ancaq bu böyük hadisənin işığı altında həqiqətən tədqiq edilə bilər. Çünki bu tarix çağdaş tariximizin keçmişini və gələcəyini müşahidəyə yarayan yüksək bir baxım nöqtəsidir" [9, 84]. Qeyd olunan fikirlər Azərbaycan tarixinin yeni dövrü çərçivəsində tariximizin tədqiqinə obyektiv yanaşmağın yollarını bizə aşılayır. Bütövlükdə, Cümhuriyyət xadimlərinin qələmə aldıqları tarixi əsərlər tarix elminin inkişafında xüsusi bir mərhələ təşkil edir. Çünki, 1813-cü il Gülüstan və 1828-ci il Türkmənçay müqavilələrindən sonra uzun müddət tariximizin daha dərin şəkildə təhrifi yolunda Çar Rusiyası tərəfindən "böyük işlər" görülmüşdür. Lakin qısa müddətdə olsa Cümhuriyyət xadimlərinin tariximizə gətirdiyi obyektiv baxışlar sanki bu elmin inkişafında müəyyən mənada oyanış rolunu oynadı. 1920-ci il, 27 aprel işğalından sonra Azərbaycan Demokratik Respublikasının qurucuları, ictimai-siyasi xadimlər, görkəmli ziyalılar mühacirətə getmək məcburiyyəti qarşısında qaldılar. Azərbaycanda qalan milli qüvvələr 20 il, mühacirətdəkilər isə fasiləsiz olaraq 70 il Sovet imperiyasına qarşı mübarizə apardılar. Qeyd edək ki, onların tarixi araşdırmaların əsas qayəsini C. Zeynaloğlunun "Müxtəsər Azərbaycan tarixi" kitabına giriş hissəsində yazdığı kimi: "Özümüzü tanımalı, başqalarına da tanıtdırmalıyıq"[11, 5] prinsipi təşkil edirdi. V. Nuhoğlu imzasıyla çıxış edən mühacirlərimizdən biri "Tariximiz yazılarkən" məqaləsində məsələni belə qoyurdu: "Azərbaycan tarixi yazılmalıdır. Buna şübhə yoxdur. Fəqət, belə bir milli tarixi kim yazacaqdır?... Bolşeviklər, hüsnü niyyətlə hərəkət etsələr belə, yaza bilərlərmi? Xeyr, əsla!". Daha sonra müəllif, "millət" və "milli dövlət" anlayışlarını qəbul etməyən bolşeviklərin, milli tarixi yazarkən sinfilikdən, kosmopolitizmdən yaxa qurtara bilməyəcəkləri qənaətinə gələrək yazırdı: "Öz milli tariximizi, bolşeviklər, ruslar deyil, biz özümüz yazacağız" [6, 224]. Əslində bu fikri tədqiqatçı mühacirlərimizin yardıcılıq devizi kimi qəbul etmək olar.

Sovet tarixşünaslığından fərqli olaraq mühacirət nümayəndələrinin başlıca tədqiqat prinsipləri müstəqillik, türkçülük və islamçılıqdır. Fikrimizi əsaslandırmaq üçün tarixə aid əsərlərin dövrləşməsindən və başlıqlara verilən adlardan bir neçə nümunəyə müraciət edək:

1. C. Zeynaloğlunun "Müxtəsər Azərbaycan tarixi" əsərindəki başlıqlar - "İstiqlalın elan olunmasından əvvəlki zaman", "Müstəqil Ağqoyunlu, Qaraqoyunlu dövləti", "Müstəqil xanlıqlar dövrü", "Müstəqil cümhuriyyət dövrü" və s.;
2. M. Ə. Rəsulzadənin "Qafkaziya türkləri" əsərindəki başlıqlar-"Türk ünsürünün Qafkaziyada yerləşməsi", "Azərbaycan və Türk Qafkaziyanın siyasi müqqəddəratı", "Qafkaziyada Türk və İslam cumhuriyyətləri", "Dağıstanda türk qövmləri" və s.

"İran Türkləri", "Azərbaycan tarixində türk Albaniya" kimi əsərlərdə isə məsələ yenə adından bəlli olur. Göründüyü kimi, mühacirlərimiz dövrləşmədə A. Bakıxanovun "Gülüstani-İrəm" əsərindəki müstəqillik həm də millilik prinsipi ilə bölgünü əsas götürərək, B. Sısoyevin istila və əsarətə görə bölgü prinsipinə (Azərbaycan sasani, ərəb, səlcuq, monqol və b.-ların əsarəti dövründə) istinad etməyiblər. İstila və əsarətə görə bölgü imperialist məfkurənin təzahürü idi ki, M. Ə. Rəsulzadənin "Çağdaş Azərbaycan tarixi" əsərində qeyd etdiyi kimi bu prinsip təkcə tarixə deyil, ədəbiyyata, bütövlükdə isə mədəniyyətə də tətbiq olunmuşdur.

Mühacirətdə Azərbaycan tarixi bütöv türk tarixinin tərkib hissəsi kimi tədqiq edilir ki, bu xüsusiyyət özünü M. Ə. Rəsulzadənin yaradıcılığında daha aydın büruzə verir. Onun "Çağdaş Azərbaycan tarixi", "Qafqasya Türkləri", "İran Türkləri" əsərlərini Qafqaz və İranda yaşayan türklərin tarixinə həsr olunan trilogiya kimi qəbul etmək olar. "Qafqasya Türkləri"ndə müəllif, Şimali Qafqazda (Qazı Qumıq, Noqay, Türkmən, Balkar, Qaraçay və s.) Borçalıda, Ahsıxa və Axırkələkdə, Gümrü və Zəngəzur bölgələrində məskunlaşan türklərin həm də qeyri-türk müsəlmanların tarixi, tarixi coğrafiyası, etnoqrafiyası, mədəniyyəti, məişəti, mövcud ictimai-siyasi durumu barədə ətraflı məlumat verir, Qafqazda ümumi türklərin bölgə əhalisini 34%-ni, müsəlman qeyri-türklərin isə 26%-ni təşkil etdiyini bildirir [6, 225].

Gürcüstan türklərinin ümumi saylarını 200.000-dən artıq olduğunu göstərən M. Ə. Rəsulzadə, Ermənistanda bu miqdarın iki dəfə artıq olduğunu yazır: "Bunların miqdarı 450.000 bulmaqdadır ki, Ermənistan Cümhuriyyətinin 28%-ni təşkil edirlər" [8, 94]. Bu bilgilər Qafqaz türklərinin deportasiyalara qədərki etno-demoqrafik vəziyyətlərinin öyrənilməsi baxımından da çox qiymətlidir. Əsərin "Rus istilasında yüz sənə" adlı bölməsində əksəriyyəti (60%-i) türk və müsəlman qeyri-türklərdən ibarət olan Qafqaz əhalisinin bir əsrlik əsarətdən sonra yenidən hürriyyətə qovuşmaq istəyi və bu istəyin gerçəkləşməsinin əsas şərti sayılan türkçülük və islamçılığın bölgədə hakim rolu açıqlanır. "Qafqasya Türkləri" ümumqafqaz türkləri və müsəlman qeyri - türklərinin tarixi, mədəniyyəti barədə Azərbaycan tarixşünaslığında ilk tədqiqat

əsəridir. M. Ə. Rəsulzadənin maraq doğuran əsərlərindən biri də Cənubi Azərbaycan mədəniyyətinə, tarixinə, mövcud durumuna, eyni zamanda bütöv Azərbaycan məsələsinin bir sıra məqamlarına aydınlıq gətirən "İran Türkləri"dir. 1908-1911-ci illərdə İranda aparılan müşahidələrin və araşdırmaların yekunu kimi ərsəyə gələn bu əsər, 1912-ci ildə "Türk Yurdu" dərgisində, 1993-ci ildə isə Əli Yavuz Akpınar tərəfindən dərc edilmişdi. İran dövlətinin gəlişməsində türklərin tarixi rolundan bəhs edən M. Ə. Rəsulzadə, həm də XIX əsrin II yarısından başlayaraq ortaya çıxan problemləri araşdıraraq belə qənaətə gəlir: "İranda Türklər nə Rusiyada olduğu kimi məhkum, nə də Türkiyədə olduğu kimi hakim bir millət deyildilər. İran Türklərini əsl iranlı olan farslarla hüquqda müsavi vətəndaş halında bulunurdular: eyni haqlara, eyni imtiyazlara sahibdilər" [7, 17-18]. Lakin əsrin əvvəllərində mövcud olan bu "müsavilik" (bərabərlik), fars-türk tarazlığı tədricən farsların xeyrinə dəyişməyə başladı. Bu dəyişmənin səbəbləri və prosesin dinamikası M.Ə.Rəsulzadənin aşağıdakı mülahizəsindən aydın görünür: "Farslar türk hökmdarlarını İran padşahları kimi, türklər də fars mədəniyyətini və lisanını milli bir [6, 226] lisani-ərəbi kimi qəbul etmişlər. Bu sürətlə beş yüz sənədən bəri şahlıq taxtında bir türk xanı otururdusa da gərək bu xanlar, görərsə də türk əhalisi iranlaşmış, yəni farslar tərəfindən təmsil olunmuşdur" [7, 17-18]. Daha sonra müəllif iranlaşmanın da səbəblərinə toxunaraq fikrini belə açıqlayır: "Şiəlik İran türklərini o qədər farslaşdırmışdır ki, indi onlar kəndlərini türkləşmiş fars, yəni əsasən iranlı hesab edirlər" [7, 18]. Əslində məsələ göründüyü qədər də sadə deyil. M. Ə. Rəsulzadənin də qeyd etdiyi kimi "türklərin farslara mənəvi məğlubiyyətlərinin" kökü [7, 18] İran coğrafiyasında uzun illər dövlətlər qurub idarə edən ayrı-ayrı türk tayfalarının fəaliyyəti ilə bağlıdır. Uzun müddət İranda siyasi hakimiyyət türklərin olsa da, mədəni və lisani-ədəbi hakimiyyət farslara məxsus idi. "İran türklərin"ndə M.Ə.Rəsulzadə İran və Qafqaz, bütövlükdə isə bütün türklərin tarix, mədəniyyət və ictimai həyatlarında mövcud olan oxşar, ümumi xüsusiyyətləri təhlil etməklə yanaşı, Şimali və Cənubi azərbaycanlıların arasında bir sıra psixoloji və mədəni fərqlərin olduğunu da unutmamışdı. M.Ə.Rəsulzadənin "Çağdaş Azərbaycan tarixi" əsəri məzmun və qarşıya qoyulan problem baxımından "Azərbaycan Cümhuriyyəti" həm də "Qafqasya Türkləri"ndə ən böyük bölmə olan eyni adlı bölmə (Azərbaycan Cümhuriyyəti) ilə eyniyyət təşkil edir. Hər üç əsərdə Azərbaycan Demokratik Cümhuriyyətinin meydana gəldiyi ictimai-siyasi, tarixi şərait, XX əsrin əvvəllərində yaranmış beynəlxalq şəraitin Azərbaycan daxili proseslərə təsiri, nəhayət Azərbaycan Cümhuriyyətinin yaranması, iki illik fəaliyyəti, məğlubiyyəti və bu məğlubiyyətin obyektiv-subyektiv səbəbləri araşdırılmışdır. M.Ə.Rəsulzadənin XIX əsrin sonu, XX əsrin əvvəllərini əhatə edən Azərbaycan tarixinə bir neçə dəfə qayıdışı hər şeydən əvvəl, Azərbaycan probleminə beynəlxalq ictimaiyyətin diqqətini cəlb etmək, yaxın tarixi keçmişdə bölgədə baş verən hadisələr barədə obyektiv rəy yaratmaq istəyindən irəli gəlirdi. Lakin əsərlərin yazılmasında məqsəd oxşar olsa da, hədəflər fərqli idi. Belə ki, 1923-cü ildə nəşr olunan "Azərbaycan Cümhuriyyəti"nin əsas ünvanı Türkiyə ictimaiyyəti idisə, 1951-ci ildə Avropada çapdan çıxan "Çağdaş Azərbaycan tarixi" Qərb ictimaiyyətini hədəf götürmüşdü. 1928-ci ildə Yusif Akçuranın rəhbərlik etdiyi "Türk yurdu"nda hissə-hissə dərc edilən "Qafqasya türkləri" isə Türkiyə ictimaiyyətini ümumi Qafqaz türklərinin tarixi və çağdaş problemləri ilə tanış etmək məqsədi ilə yanaşı, bu ölkədə məskunlaşan Qafqaz mühacirləri arasında iş birliyi, Müştərək təşkilatlar yaratmaq üçün həmin mühacirət kontingentinə də ünvanlanmışdı. Məqsədlərin nə qədər maraqlı və əhəmiyyətli, hədəflərin çeşidli olmasına baxmayaraq, tədqiq olunan Azərbaycan tarixi idi ki, son nəticədə elm daha çox qazanırdı. Qeyd edək ki, mühacirlərimizin araşdırdığı problemlərin əksəriyyəti 80-ci illərin sonlarından başlayaraq formalaşmaqda olan yeni baxışdan aktual və əhəmiyyətli görünür [6, 228].

Bütövlükdə nəzərdən keçirilənləri yekunlaşdıraraq belə qənaətə gələ bilərik ki, Azərbaycan Xalq Cümhuriyyəti xalqımızı yalnız milli istiqlalına qovuşdurmaqla qalmayıb Azərbaycan tarixinə baxışda obyektiv fikrin, tarix elminin inkişafında müstəqil bir istiqamətin formalaşmasına da öz töhfəsini vermişdir.

## THE PLACE AND ROLE OF AZERBAIJAN DEMOCRATIC REPUBLIC IN THE DEVELOPMENT OF HISTORY SCİENCE

***Keywords:*** *History science, Society for the Study of the Muslim East, Istiqlal museum, Baku State University, archive job.*

*One of the biggest contributions of Azerbaijan Democratic Republic in the development of Azerbaijan's history science was establishing of "Society for the Study of the Muslim East". The decision on establishment of university in Baku on 01 September, 1919 during the assembly of the Azerbaijan Democratic Republic's Parliament and taking into account being history-philology faculty one of the University's four faculties in this law was important step in the development of history science.*

*Azerbaijan Democratic Republic could not find the opportunity to make changes in the archive job for the short, but difficult and complicated situation. Despite this, the government of the Democratic Republic of Azerbaijan could organise and realize this work.*

*Opening of Istiqlal museum on december, 1919 became important evidence in the history of Azerbaijan's culture.*

*Overall, Azerbaijan Democratic Republic founders, including Mammad Amin Rasulzadeh even after fall of the Azerbaijan Democratic Republic can give contribution and necessary direction to the objective investigation of the history science of Azerbaijan with their works.*

**İstifadə edilmiş ədəbiyyat**

1. "Azərbaycan" qəzeti, 1919, 23 sentyabr
2. Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. İki cilddə. I cild. Bakı: Lider nəşriyyatı, 2004, 440 s.

3. Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. İki cilddə. II cild. Bakı: Lider nəşriyyatı, 2005, 472 s.
4. Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin 70-ci iclası. 1 sentyabr 1919-cu il. Arxiv, f. 895. siy. 1, iş 9, vər. 64-65
5. Xələfov A. Professor V.İ.Razumovskidən akademik A.M.Məhərrəmova qədər keçilmiş inkişaf və tərəqqi yolu.// Kitabxanaşünaslıq və biblioqrafiya: elmi-nəzəri, metodik və təcrübi jurnal. Bakı: Bakı Universiteti Nəşriyyatı, 2009, №2, s. 28-48
6. İbrahimli X. C. Azərbaycan mühacirəti tarixi. Bakı: ADPU nəşriyyatı, 2012, 358 s.
7. Resulzade M. E. İran türkleri (Türk Yurdu və Sebilürreşaddakı yazılar), hazırlayanlar Yavuz Akpınar, İrfan Murat Yıldırım, Selahattin Çağın. İstanbul: Türk Dünyası Araşdırmaları Vakfı, 1993, 132 s.
8. Resulzade M. E. Kafkasya Türkleri. Hazırlayanlar: Yavuz Akpınar, İrfan Murat Yıldırım, Sabahattin Çağın. İstanbul : Türk Dünyası Araştırmaları Vakfı, 1993, 132 s.
9. Rəsulzadə M.Ə. Əsrimizin Səyavuşu, Çağdaş Azərbaycan ədəbiyyatı, Çağdaş Azərbaycan tarixi. Bakı: Gənclik, 1991, 112 s.
10. Şəmsi F. Azərbaycanda ilk dövlət muzeyi// "Mədəniyyət" qəz., 2013, 4 dekabr
11. Zeynaloğlu C. Müxtəsər Azərbaycan tarixi: elmi-publisistik və tarixi kitab; Red. T.İsmayılova; Ön sözün və şərhin müəllifi. K.Şükürov; Transliterasiya edən. M.Teymur. Bakı: Azərbaycan Dövlət Kitab Palatası, 1992, 144 s.
12. Васильков Я. В. Люди и судьбы: биобиблиографический словарь востоковедов-жертв политического террора в советский период (1917-1991). Санкт-Петербург: Петербургское Востоковедение, 2003, 495 с.
13. Соегов М. Востоковед Л. А. Зимин и его перевод сочинения неизвестного автора о действиях Омар-шейха, сына Тамерлана.//Вестник Алтайского государственного педагогического университета, 2017, № 30, с.61-70

## AZERBAYCAN EDEBİYATINDA İSTİKLAL KONUSUNUN TARİHİ GEÇMİŞİ (A.CAFEROĞLU'NUN MAKALELERİNE İSTİNADEN)

**Afina BARMANBAY / Belkız DİLMAÇ**

**Azerbaycan Edebiyatında İstiklal Konusunun Tarihi Geçmişi**
**(A.Caferoğlu'nun makalelerine istinaden)**

Bolşevik Rus inkılâbından sonra Rus hegemonyası altındaki halkların siyasi ve aydın kesimi ülkeyi terk etmek zorunda kalmıştır. Bu sırada Türkiye'ye akın eden muhacirler İstanbul'da kendi yayın organlarıyla mücadelelerine devam ederler. Fakat 1930'lu yıllardan başlayarak, Sovyetlerin Türkiye'ye baskıları sonucu, başta siyasi basın olmak üzere, bu gazete ve dergiler kapatılır, vatana dönmek söz konusu olamayacağına göre, vuslattan vuslata savrulan aydınlar Avrupa'ya göç etmeye başladılar. "Azerbaycan Yurt Bilgisi" dergisi her ne kadar direk siyasetle ilgili yayın yapmıyor olsa da Sovyetlerin baskısıyla bütün muhacir matbu organlarına yapıldığı gibi, bu derginin de üç yıl sonra yayın hayatına son verilir. Dergi bu üç yılda, Rus hegemonyası altındaki Türk halklarının düştüğü umutsuzluk ve milli-manevi boşluğu çok kısa bir sürede doldurarak onlara umut ışığı oldu.

Ahmet Caferoğlu'nun Azerbaycan edebiyatında istiklal konusu üzerine yazdığı makaleler bu konuda yazılmış ilk araştırma olup, editörlüğünü yaptığı "Azerbaycan Yurt Bilgisi" dergisinde yayınlanmıştır. *"Azeri Edebiyatında İstiklal Mücadelesinin İzleri"* başlığı altındaki silsile makalelerin daha ilkine baktığımızda, muhacirlerin Azerbaycan'ın istiklaliyle ilgili ümitlerini katiyen yitirmedikleri hemen belli olmaktadır. Caferoğlu, Rus tarihçilerin hakikatleri tahrif ederek taraflı bir şekilde yazıp çizdikleri tarihi olaylar dikkate alınmazsa, istila sonucunda Azerbaycan tarihinin yazılmadığını, bu nedenle de istiklal mücadelesinin izlerini milli edebiyatta aramanın doğruluğunu vurgular. Makalede, Rus tarihçilerinin eserlerinde gayri-Rus milletlerinin istiklal mücadelesinin korsan harekâtı olarak gösterildiği, şehir ve kentlerin adlarının Rus adlarıyla değişimi ve bütün bunların Rus tarihçileri tarafından övüldüğü, kaynaklarıyla ortaya konulmuştur. Caferoğlu, konuya girdiğinde *"maksadımız tamamıyla siyasetten uzak olup sırf Azerbaycan Türklerinin Rus istilasına karşı açtığı mücadele ve istiklal cengi etrafında yazılan milli, klasik ve halk edebiyatını araştırmaktır"* [1, s. 294] der. Fakat hem Rus siyasetinin getirdiği sıkıntılardan dolayı, hem de milletinin Rus siyasetine kurban edilmiş olması, ister istemez onda Rus istilacılarına karşı kin ve nefret duygusu uyandırmıştır ve o, bu duyguyu her zaman bastıramamıştır. Bu nedenle de Rus generali Sisyanov'un Cavad Hana istihzayla söylediği *"milçeyin* karga ile muharebe etmesi mümkün* mü?" sözlerini hatırlatarak, Sisyanov'un Türk kahramanı Cavad Hana hitap şekli milli edebiyatta Ruslara karşı bir kin ve nefretle aks edileceğini vurgular [1, s.293]. İlk makalenin giriş bölümünde yazılmış olan bu sözler, aslında dört makalenin de ideolojisini ve ruh yönünü belirler. Makalede, Gence Hanlığının Ruslar tarafından işgali meselesi ve *Abdurrahman Ağa* ile *Genceli Hasan* adlı şairlerin Cavad Han hakkında yazdıkları eserler ele alınmıştır [1, s.296]. Şair Hasan, Rus ordusunun bayram gecesinde hücum ederek her kesi kılıçtan geçirip, Gence'yi al kana boyadığını anlatırken şiirin lirizmini bozmamıştır: *"O zamanki Cavad Hanı vurdular, Sanasan qırıldı beli Gence'nin"*. Caferoğlu, samimi tarzda yazılmış bu şiiri, tarihi sahteleştirmeğe çalışanlara cevap olarak sunar.

* Milçek - sinek